*Azərbaycan Aqrar Elmi* 1 2018 *Аграрная Наука Азербайджана*

UOT: 581.9

# NAXÇIVAN MUXTAR RESPUBLİKASI FLORASINDA *EUPHORBİACEAE* JUSS. FƏSİLƏSİNƏ DAXİL OLAN YENİ NÖVLƏR

**T. H. TALIBOV**
**AMEA Naxçıvan Bölməsi**
**S. F. XUDAVERDİYEVA**
**Naxçıvan Dövlət Universiteti**

*Məqalədə, Naxçıvan Muxtar Respublikası ərazisində Euphorbiaceae Juss. - Süddüyənkimilər fəsiləsinin Euphorbia L. və Acalypha L. cinslərinə daxil olan yeni aşkar edilən Acalypha australis L., Acalypha hispida Burm. f., Euphorbia milli var. spendens və Euphorbia marginata Pursh süddüyən növləri təqdim edilmişdir. Yeni növlərin bioloji xüsusiyyətləri və bəzi əhəmiyyətli cəhətləri göstərilmişdir.*

***Açar sözlər:*** *Flora, Euphorbiaceae, Acalypha, bioloji xüsusiyyətlər, taksonomik spektr, süddüyən*

Naxçıvan Muxtar Respublikasının coğrafi mövqeyi və torpaq-iqlim xüsusiyyətlərinə görə Qafqaz ekoregionunda seçilən ərazilərindən biridir. Əlverişli coğrafi mövqeyi, özünəməxsus təbii şəraiti, xüsusən günəşli günlərin çoxluğu burada zəngin floraya malik bitki örtüyünün formalaşması ilə bərabər, eyni zamanda yeni növlərin əmələ gəlməsi üçün zəmin yaratmışdır. Ərazi florasına əlavə edilən yeni taksonları və bəzi fəsilələrdə aparılan taksonomik dəyişkənlikləri də nəzərə alaraq, hal- hazırda Naxçıvan MR florasında ali sporlu, çılpaqtoxumlu və örtülütoxumlu bitkilərin 176 fəsilə və 908 cinsə birləşmiş 3021 növünün olduğu müəyyənləşdirilmişdir ki, bu miqdar da Azərbaycan florası növlərinin 60,42%-ni təşkil edir.

Süddüyənkimilər fəsiləsi örtülütoxumlu bitkilər içərisində ən çox növü olan fəsilələrdən biri olub, buraya həyat formasına görə ağaclar, kollar, lianlar və otlar daxildir. Onun Yer kürəsində 300 cinsə daxil olan 7500 - dən çox növü yayılmışdır. A.A. Qrossheymin [10, s.458 - 470] məlumatına görə Azərbaycan Respublikasında fəsilənin 5 cinsinə daxil olan 34 növü, “Флора Азербайджана” [18, s.101- 138] və E.Qurbanovun [2, s.223- 226] əsərində fəsilənin 6 cinsinə aid 46 növü, A. Əsgərovun [1, s.213- 215] məlumatında bəzi introduksiya edilmiş mədəni floraya aid növlər də daxil olmaqla 8 cinsə daxil olan 55 növün olduğu qeyd olunur. Son dövrlər bu zənginliyə bir səbəb də yeni adventiv növlərin əraziyə gətirilərək introduksiya edilməsi, hətta onlardan bəzilərinin naturalizasiya həddinə çatdırılmasıdır. Keçirilən floristik tədqiqatlar zamanı Süddüyənkimilər fəsiləsinə aid yeni 4 növ aşkar edilmişdir.

*Euphorbia* L. - Süddüyən cinsi fəsilənin ən böyük cinsi olub, Naxçıvan MR-də əvvəllər 17 növünün olduğu göstərilirdi, lakin sonrakı tədqiqatlarda əlavə olaraq 2 növ: *Euphorbia humilis* C.A. Mey. - Yatıq süddüyən və *E. marschalliana* Boiss. – Marşal süddü yəni yeni aşkar edilərək floraya əlavə olunmuşdur [3]. Hal - hazırda ərazimizdə fəsilənin respublikamızda yayılan 46 növündən 24-ü bu cinsin payına düşür. Azərbaycanda bu növlərdən bir çoxunun yayılması, yalnız Naxçıvan MR ərazisi ilə məhdudlaşır məsələn, *Euphorbia arvalis Boiss*. et Heldr. - Əkin süddüyəni, *E. eriophora* Boiss. - Tükcüklü s., *E. orientalis* L. - Şərq s., *E. grossheimii* Prokh. - Qrossheym s., *E. azerbaydzhanica* Bordz.- Azərbaycan süddüyəni və *Euphorbia turcomanica* Boiss.-Türkmən s.[4,5].

Ərazidə baş verən kompleks təbii faktorlar və antropogen təsirlərdən dəyişən ekoloji mühit nəticəsində bir çox aborigen növlər öz yayılma arealını və ya zonasını genişləndirərək demək olar ki, bütün ekosistemlərdə təmsil olunmaq imkanı qazanmışdır. Belə ekspansiv növlərə *Euphorbia* L. - Süddüyən cinsinə aid *Euphorbia seguieriana* Neck. - Sequyer süddüyəni də misal ola bilər. Arazboyu maili düzənlik zonasından başlayaraq, yuxarı dağlıq ərazilərə qədər bu növ demək olar ki, bütün fitosenozlarda müxtəlif formalarda təmsil olunur. Son dövrlər muxtar respublika florasının tədqiqi nəticəsində ərazi florası üçün mədəni florada rast olan bir çox yeni növlər aşkar edilmişdir. Araşdırmalar nəticəsində Süddüyənkimilər fəsiləsinə aid mədəni florada aşkar edilən bitkilərin invaziv növlər olduğu müəyyənləşdirildi. İnvaziv növlər başqa ölkələrdən xüsusi olaraq və ya təsadüfən gətirilən, eyni zamanda ekoloji mühitin dəyişməsi ilə əlaqədar olaraq miqrasiya yolu ilə digər regionlardan əraziyə daxil olan növlərdir. Yaşıllaşdırma məqsədi ilə əraziyə gətirilərək introduksiya edilən növlər içərisində Süddüyənkimilər fəsiləsinin *Acalypha* L. - Akalifa cinsinə aid *Acalypha australis* L. -Cənub akalifası və *Acalypha hispida* Burm. f. - Qılçıqlı akalifa, *Euphorbia* L. - Süddüyən cinsinə isə *Euphorbia milli* var. *spendens* - Millius süddüyəni və *Euphorbia marginata* Pursh - Haşiyəli süddüyən növləri yeni aşkar edilmişdir.

*Acalypha* L.- Akalifa və ya tülküquyruğu cinsinə daxil olan bitkilər birillik və çoxillik olub, həmişəyaşıl

kolcuq, kol və ağacşəkilli bitkilərdir. Yarpaqları ürəkşəkilli formada olub, kənarları mişardişlidir. Çiçəkləri kiçikdir, sünbülşəkilli başcığa toplanmışdır. *The Plant List* (2013) məlumatına görə cinsin 454 növü vardır. Bir çox növü dekorativ çiçəkli bitki kimi becərilir. Bitkinin bütün hissələrində zəhərli şirə vardır, ona görə də akalifanı becərərkən ehtiyatlı olmaq lazımdır.

*Acalypha australis* L. - Cənub akalifası. A.A. Qrossheym tərəfindən "Флора Кавказа" əsərində ilk dəfə olaraq Abxaziya və Acariyadan toplanılmış materiallar əsasında adventiv növ kimi *Acalypha australis* L. - Cənub akalifası təsvir edilmişdir (10, s.73). Gövdəsi düz qalxan və budaqlanan, 30-50 cm hündürlükdə olan birillik bitkidir. Yarpaqları yumurtavari-üçbucaqşəkillidir, 5-6 sm uzunluqda, 2-3 sm enində olub, örtük yarpaqları çəpər kimidir və dəyirmi - yumurtavari, iti ucludur, kənarları mişardişlidir. Coğrafi tipi: adventiv(Cənubi-şərqi Asiya). Daha sonra Zernov A.S. və Mirzoyeva Ş.İ. (11, s.10-14) bu növü Apşeron yarımadasında Qobustan muzeyi ətrafındakı qazondan (25.06.2012) toplamışlar. Mehdiyeva N.P. və Qeltman D.V. bu növü Azərbaycan florası üçün gəlmə bir növ kimi yenidən təqdim etmişlər(14,s.403-406).

Cənub akalifası növü 2017-ci ilin sentyabr ayında AMEA NB Bioresurslar İnstitutunun inzibati binası ətrafındakı gülzarlıqdan və Babək rayonunun Şıxmahmud kəndi yaxınlığında yerləşən Bioresurslar İnstitutunun Nəbatat bağındakı Rozaridən toplamış və təyin etmişik. Hürbari materialları Bioresurslar İnstitutunun Herbari fondundadır.

*Acalypha hispida* Burm. f. - Qılçıqlı akalifa (Filippin meduzası, qırmızı pişik quyruğu və tülküquyruğu) çiçəkli koldur. Bu bitki gözəl çiçəklərinə və görünüşünə görə otaq bitkisi kimi becərilir. Malaziyada naturalizasiya edilərək ABŞ və Meksikaya satılır. Bitkinin hündürlüyü 1,8-3,7 m, əhatəsi isə 0,9-1,8 m-ə qədər olur. Bitki toxum və çiliklərlə asanlıqla çoxaldıla bilir. İqlim faktorları imkan verilən ölkələrdə onu otaq şəraiti ilə bərabər, həyətyanı sahələrdə də əkmək olur. Lakin bu bitkinin bütün hissələrinin zəhərli olduğu unutulmamalıdır, belə ki, orqanizmə düşən kimi onu zəhərləyə bilər. İkievli bitkidir, ona görə də erkək və dişi orqanları daşıyan ayrı-ayrı çiçəkləri mövcuddur. Dişicik daşıyan çiçəklərin rəngi bənövşəyidən parlaq - qırmızıya qədər dəyişə bilir və əsasən mərkəzdə toplanır. Bu əlamətinə görə bitkini bəzən "alovlu pişik quyruğu" kimi də adlandırır və asma dibçəklərdə yetişdirirdilər.

Qeltman D.V. (9) Azərbaycan florasında *Euphorbia* L. (*Euphorbiaceae*) cinsinin növ müxtəlifliyi haqqında ətraflı məlumat verərək göstərir ki, Respublika ərazisində hal-hazırda 39 növ süddüyən yayılmışdır ki, onlardan da 6 növü əraziyə bu və ya başqa yollarla daxil olan növlərdir. Ərazi florası üçün ilk dəfə olaraq *E. armena* Prokh., *E. coniosperma* Boiss. et Buhse, *E. daghestanica* Geltman və E. *glaberrima* K. Koch növlərini vermişdir.

*Euphorbia milli* var. *spendens* - Millius süddüyəni çoxillik kol bitkisi olub, sukkulentdir. Növün adı onu Madaqaskar adasından 1821-ci ildə Fransaya gətirən Reynon adasının qubernatoru baron Pyer Bernar Milliusun şərəfinə adlandırmışlar. Belə rəvayət vardır ki, bu bitki İsa (ə.s.) peyğəmdərin tacının düzəldilməsində istifadə olunmuşdur, bəzən bunu gövdəsində çoxlu miqdarda tikan olduğuna görə "tikanlı tac" da adlandırırlar. Digər bir adı *Euphorbia splendens*- Parlaq süddüyəndir.

Hündürlüyü 1,8 m olan, çoxlu budaqlanan, Madaqaskarın endem bitkisidir. Gövdəsi kifayət qədər yoğun, bozumtul rəngli, qabırğalı olub, iri iti tikanlarla örtülüdür. Təpə hissədə uzunluğu 3,5 sm, eni 1,5 sm olan ellips formalı, yaşıl rəngli yarpaqlar formalaşır ki, onların da altında iki yarpaqaltlığı əmələ gəli və onlar da tikana çevrilirlər. Yarpaqlar inkişaf etdikcə solaraq düşür, lakin formalaşan tikanlar isə ömürlük qalırlar, ona görə də yarpaqlar yalnız bitkinin zirvə hissəsində olur. Süddüyən cinsi içərisində ən paralq çiçəkləri bu növə aiddir. Çiçəkyanlığı ləçəklərinin eni 12 mm olub, ovaldır. Çiçəklər 2-4 qrup çiçəkdən formalaşaraq çiçəyanlığı ilə əhatələnmişdir.

Tropik ərasilərdə bu növdən keçilməz canlı hasar formalaşdıraraq istifadə edirlər, lakin ən çox çilikləri vasitəai ilə çoxaldılan dekorativ otaq bitkisi kimi istifadə olunur. Mitoxondri və nüvə DNT-si araşdırmaları nəticəsində parazit bitki hesab edilən və dünyada ən böyük çiçəyə sahib olan (*Raffiesia arnoldii* R.Br.) Raffleziya cinsi də *Euphorbiaceae* fəsiləsinə daxildir. Maraqlıdır ki, təkamüldə ən kiçik və mürəkkəb quruluşlu çiçəyə doğru istiqamət tapan Süddüyənkimilərdə nədənsə, belə böyük çiçək formalaşmışdır. Son araşdırmalarda bu cinsi ayrıca fəsilə kimi təqdim edən materiallar da mövcuddur.

*Euphorbia marginata* Pursh - Haşiyəli süddüyən.

Bu növün vətəni Şimali Amerikada Kanadanın şərqindən başlayıb Amerika Birləşmiş Ştatlarının cənubi-qərb hissəsinə qədər olan əraziləri əhatə edir. Çinin bütün ərazilərində naturalizasiya edilmişdir. Növ ilk dəfə olaraq Ulyam Klark tərəfindən Montana ştatının Royzbeq ətrafina edilən ekspedisiya zamanı Yelloston çayı sahilindən toplanılan nümunələrə əsasən təyin edilmişdir. Bitki bozumtul-yaşıl rəngli və kənarlarından qar rəngli haşiyələr keçən yarpaqlara malikdir. Növün adı da buna görə verilmişdir.

Birillik, terofit bitki olub, 60-80 (100) sm hündürlükdədir və vegetativ zoğları olmur. Çiçək daşıyan zoğları düz, nazik, bir neçə dəfə dixotamik budaqlanan, sıx yarpaqlı, xüsusən yuxarı hissəsində zərif və yumuşaq tükcüklüdür. Yarpaqları qarşı-qarşıya, dəstəli 2,5-5,5 sm bəzən 7,5 sm uzunluqda, yumurtavaridən tərsyumurtavariyədək, bəzən uzunsov - oval, tamkənarlı, açıq - yaşıl rəngli, çiçəkləmə dövründə kənarlarından qar rəngli цветоносами haşiyə

keçən oturaq yarpaqlıdır. Budaqlarının adətən təpə hissəsində olan 3 sadə çiçəkdaşıyıcısı vardır. Siatiumun kasa hissəsi ağ rəngli olub, çox kiçikdir. Çətiri əhatə edən yarpaqlar kiçikdir, yumurtavari - oval formadadır, ağ rəngdədir. Mürəkkəb çətiri əhatə edən yarpaqlar elleptik və ya yumurtavari- elleptik formada olub, 2,5 sm uzunluqdadır, dəstə halında olub, mərkəzdən açıq yaşıl rəngli xətt keçməklə ağ rənglidir. İyul- avqust ayında çiçəkləyir, sentyabr-oktyabr aylarında toxumları yetişir. Dekorativ bitki kimi istifadə edilir, xüsusən alleyalarda şaxtalar düşənə qədər öz rəngini saxlaya bilir. İşıqlanmanı sevir, lakin kölgəli yerlərdə yarpaq parlaqlığını itirirlər. İstiliyə və susuzluğa yüksək davamlı olub, təqribən mənfi 34 dərəcəyə davam gətirir. Mədəni halda kulturaya 1811-ci ildən daxil edilmişdir, xüsusən landşaft memarlığında aranjirovka məqsədi ilə geniş tətbiq edilir.

*Euphorbiaceae* Juss. - Süddüyənkimilər fəsiləsinin son tədqiqat işləri görkəmli araşdırmacısı D.V. Qeltmana (7,8) məxsusdur. Qeyd etmək lazımdır *Euphorbia stricta* L. - Şüv süddüyən növünün bütün qonşu ölkə floralarında, eyni zamanda "Naxçıvan Muxtar Respublikası florasının taksonomik spektri" kitabında göstərilməsinə baxmayaraq D.V. Qeltman bu növü siyahıya daxil etməmişdir. Onun Azərbaycan florasında *Euphorbia* L. - Süddüyən cinsinin tədqiqinə dair verilən materialları və bizim aşkar etdiyimiz yeni növləri də daxil etsək, onda fəsilənin son sistematik spektri aşağıdakı kimi olar: Qeyd edilən ədəbiyyat məlumatları, aparılan tədqiqat işləri nəticəsi [12; 15; 16; 17;20;21;22;23;24], eyni zamanda "Конспект флоры Кавказа" [13,s.494-513] və S.K. Çerepanovun [19, s.428-435] əsəri ilə müqayisəli təhlildən sonra, Naxçıvan MR ərazisində fəsilənin aşağıdakı 5 cinsə daxil olan 34 növünün yayıldığı müəyyənləşdirilmişdir.

Superordo: Euphorbianae
Ordo: Euphorbiales
Familia: Euphorbiaceae Juss. - Süddüyənkimilər
Subfam.1. Phyllanthoideae Beilschm.
Trib.1. Phyllantheae Dumort.
1. Genus: Andrachne L. – Andraxne
Sect.1. Andrachne
1(1) Andrachne telephioides L. – Telefiumabənzər andraxne
2(2) A. rotundifolia C.A.Mey. ex Eichw. - Girdəyarpaq a.
Sect.2. Fruticulosae Pax ex K. Hoffm.
3(3) A. buschiana Pojark. - Buş a.
4(4) A. filiformis Pojark. - Sapvari a.
Subfam.2. Acalyphoideae Beilschm.
Trib.1. Chrozophoreae Pax ex K. Hoffm.
2. Genus: Chrozophora A. Juss. nom.cons. - Lakmusotu
5(1) Chrozophora tinctoria (L.) Adr. Juss. - Boyaq lakmusotu
6(2) Ch. hierosolymitana Spreng. - Yerusəlim l.
Trib.2. Acalypheae Dumort.
3. Genus: Ricinus L. - Gənəgərçək
7(1) *Ricinus communis L. - Adi gənəgərçək
4. Genus: Acalypha L. - Akalifa
8(1) *Acalypha australis L. - Cənub akalifası
9(2) *A. hispida Burm. f. - Qılçıqlı a.
Subfam.3. Euphorbioideae Beilschm.
Trib.1. Euphorbieae Dumort.
5. Genus: Euphorbia L. - Süddüyən
Subgen. 1. Esula (Pers.) Dumort.
Sect. 1. Helioscopia Dumort.
10(1) E. coniosperma Boiss. et Buhse - Konusvaritoxumlu süddüyən
11(2) E. eriophora Boiss. - Tükcüklü s.
12(3) E. rhabdotosperma Radcl.-Sm. – Aditoxumlu s.
13(4) E. helioscopia L. - Günəbaxan s.
14(5) E. condylocarpa Bieb. - Çıxıntılımeyvəli s.
15(6) E. orientalis L. - Şərq süddüyəni
Sect. 2. Myrsiniteae (Boiss.) Lojas.
16(7) E. armena Prokh. – Ermənistan s.
17(8) E. marschalliana Boiss. (E. woronowii Grossh.) - Marşal s.
Sect. 3. Pithyusa (Raf.) Lazaro
18(9) E. falcata L. - Oraqvari s.
19(10) E. seguieriana Neck. - Sequyer s.
20(11) E. glareosa Pall. ex Bieb. – Qığırdaq s.
Sect. 4. Sclerocyathium (Prokh.) Prokh.
21(12) E. grossheimii Prokh. - Qrossheym s.
Sect. 5. Chylogalo (Fourr.) Prokh.
22(13) E. heteradena Jaub. & Spach (E.isphahanica Boiss.) - İsfahan s.
Sect. 6. Szovitsiae Geltman
23(14) E. szovitsii Fisch. & C.A.Mey. - Soviç s.
Sect. 7. Herpetorrhizae (Prokh.) Prokh.
24(15) E. azerbaydzhanica Bordz. - Azərbaycan s.
Sect. 8. Arvales (Geltman) Geltman
25(16) E. arvalis Boiss. & Heldr. - Əkin s.
Sect. 9. Esula (Pers.) Dumort.
26(17) E. iberica Boiss. - Gürcü s.
27(18) E. virgata Waldst. et Kit. [*E. boissieriana* (Woronow) Prokh.]- Çubuqşəkilli s.
Subgen. 2. Chamaesyce Raf.
28(19) E. nutans Lag. (E. indica Lam.) – Əyilmiş s.
29(20) E. humifusa Willd. – Yatıq s.
30(21) E. chamaesyce L. (E. canescens L.) - Qısa s.
31(22) E. granulata Forssk. (E. turcomanica Boiss.) – Dənəvər s.
32(23) *E. marginata Pursh - Haşiyəli s.
33(24) *E. milli Des Moul. - Millius s.

**ƏDƏBİYYAT**

**1.** Əsgərov A.M. Azərbaycanın bitki aləmi (Ali bitkilər-*Embryophyta*), Bakı: TEAS Press, 2016, 443 s.**2.** Qurbanov E.M. Ali bitkilərin sistematikası. Dərslik. Bakı: Bakı Universiteti nəşriyyatı. 2009, 429 s.**3.** İbrahimov Ə.Ş., Talıbov T.H. Naxçıvan MR-nın florasına əlavələr / Beynəlxalq simpoziumun materialları "Naxçıvan MR-nın təbii ehtiyatları, onlardan səmərəli istifadə yolları". Naxçıvan Dövlət Universiteti. Qeyrət, 2000, s. 68 – 72. **4.** Talıbov T.H., İbrahimov Ə.Ş. Naxçıvan Muxtar Respublikası florasının taksonomik spektri (Ali sporlu, çılpaqtoxumlu və örtülütoxumlu bitkilər). Naxçıvan: Əcəmi nəşriyyatı, 2008, 350c**.** **5.** Talıbov T.H., İbrahimov Ə.Ş., Səfərova F.A. *Euphorbiaceae* Juss. – Süddüyənkimilər fəsiləsinin sistematik icmalı və tədrisi metodikası // Az.Resp.Təhsil Nazirliyi Naxçıvan Müəllimlər İnstitutu, Məktəb nəsr., №3 (15) 2008, c. 46 – 51. **6.** Гельтман Д.В. Заметки о Кавказских видах рода Euphorbia L. (Euphorbiaceae) // Новости систематики высших растений. 1991а. Т. 28, с. 110-116. **7**. Гельтман Д. В. Род *Euphorbia* L. (*Euphorbiaceae*) во флоре Крыма, Кавказа и Малой Азии. III. Секция Paralias Dumort.// Новости систематики высших растений. 2005.Т. 37, с. 134-151. **8.** Гельтман Д. В. Молочаи (*Euphorbia* L., *Euphorbiaceae*) Восточной Европы и Кавказа в зеркале новой системы рода//Turczaninowia. 2013. Т. 16, № 2, с. 30-40. **9.** Гельтман Д.В. Род *Euphorbia* L. (*Euphorbiaceae*) во флоре Азербайджана. Новости систематики высших растений. Издательство: РАН (Санкт-Петербург) İSSN: 0568-5443, Том: 47 Год: 2016, с. 85-94. **10**. Гроссгейм А.А. Флора Кавказа. Т. 6. Москва-Ленинград: Издательство АН СССР, 1962, 424 с. **11**. Зернов А.С., Мирзоева Ш.Н. Новые адвентивные виды цветковых растений во флоре Апшеронского полуострова. AMEA Botanika İnstitutunun Elmi əsərləri, 2013, XXXIII cild, s.10-14. **12.** Касумова Т.А., Сафгулиева Т.Д. Род Euphorbia L. (Euphorbiaceae) во флоре Азербайджана. Подрод (Chamaesyee). AMEA Botanika İnstitutunun elmi əsərləri, 2015-ci il, XXXV cild, s.40-42. **13**. Конспект флоры Кавказа. С. Петербург - Москва: Товарищество научных изданий КМК, 2012, Т. 3,Ч.2, 623 с. **14**. Мехтиева Н.П., Гельтман Д.В. *Acalypha australis (Euphorbiaceae)* - новый чужеродный вид для флоры Азербайджана. Ботанический журнал, Том 100, №4, 2015, с. 403-406. **15**. Мусайев С.Г. Новые местонахождения видов рода *Euphorbia* L. в Азербайджане // Докл. АН Азерб. ССР, 1988, Т. 93, № 6, с. 69-70. **16**. Мусайев С.Г. Молочайные флоры Азербайджана. Баку, (деп. ВИНИТИ, № 2636-В91) 1991, 14 с. **17.** Проханов Я.И. Род Молочай - Euphorbia L. Флора СССР, М.; - Л., 1949 т.14, с.304- 495. **18.** Халилов Э.Х. Род Молочай - Euphorbia L. Флора Азербайджана. Баку: Из-во АН Азерб. ССР, 1956, т.6, с.109-318. **19**. Черепанов С.К. Сосудистые растения России и сопредельных государств (в пределах бывшего СССР). С.-Петербург: Мир и семья- 95, 1995, 992 с. **20.** "Euphorbia marginata". Natural Resources Conservation Service PLANTS Database. USDA. Retrieved 2012-09-29. **21**. Rechinger K.H., Schiman – Czeika H. *Euphorbiaceae* (K.H. Rechinger (ed). Flora Iranica. Graz 1964, №6, 48 p. **22.** Thomas J. Delendick. "*Acalypha australis* L. (*Euphorbiaceae*) new to New York State". Bulletin of the Torrey Botanical Club. 1990, 117 (3): 291-293. JSTOR 2996697. 23. Radcliffe-Smith A. *Euphorbiaceae*// Flora of İraq/ C.C. Townsend, E. Guest, A. Al- Rawi (eds.), Vol,4, Baghdad, 1980, p.309-362. **24**. Tamanyan K. & Ali-Zade V. 2014. *Euphorbia grossheimii*. The IUCN Red List of Threatened Species 2014: e.T200167A2638126. http: //dx.doi.org/ 10.2305/ IUCN. UK.2014-1.RLTS. T200167A2638126.en . Downloaded on 16 July 2017

**Новые виды семейства *euphorbiaceae* juss. во флоре Нахчыванской Автономной Республики**

**Т.Г. Талыбов, С.Ф. Худавердиева**

В статье представлены новые выявленные виды *Acalypha australis* L., *Acalypha hispida* Burm. f., *Euphorbia milli* var. *spendens* и *Euphorbia marginata* Pursh отнеяшихся к родам *Euphorbia* L. и *Acalypha* L. во семействам *Euphorbiaceae* Juss. в территории Нахчыванской Автономной Республики. Показаны биологических особенности и важные черта новых выявленных видов.

***Ключевые слова:*** флора, Euphorbiaceae, Acalypha, биологические особенности, таксономический спектр, молочай.

**The new species of euphorbiaceae juss. family in flora of Nakhchivan Autonomous Republic**

**T.H. Talibov, S.F. Xudaverdiyeva**

The article presents new identified species of *Acalypha australis* L., *Acalypha hispida* Burm. f., *Euphorbia milli* var. *spendens* and *Euphorbia marginata* Pursh of the genus *Euphorbia* L. and *Acalypha* L. of the *Euphorbiaceae* Juss. familyes in the territory of Nakhchivan Autonomous Republic. There are shown of biological features and an important feature of newly identified species.

***Key words:*** flora, Euphorbiaceae, Acalypha, biological features, taxonomic spectrum, spurge.

**email**-t_talibov@mail.ru